DOI: 10.36719/2706-6185/02/4-8

**Şirin Teymur qızı Bünyadova**
Bakı Dövlət Universiteti
tarix üzrə elmlər doktoru
shirin_bunyad@mail.ru

# AZƏRBAYCAN ATALAR SÖZLƏRİNDƏ SƏNƏTKARLIQ SAHƏLƏRİNİN ƏKSİ

**Xülasə**

Təqdim olunan məqalə Azərbaycan atalar sözlərində öz əksini tapmış sənətkarlıq növlərinin etnoqrafik tədqiqinə həsr edilmişdir. Etnoqrafiya elminin hərtərəfli tədqiqi istiqamətində atılan addımlardan biri də şifahi xalq yaradıcılığı nümunələrinin elmi tədqiqatlara cəlb edilməsidir. Onların tərkibinə daxil olan atalar sözləri köməkçi mənbə kimi mühüm əhəmiyyət kəsb edir. Beləliklə, atalar sözlərindən etnoqrafik zəruri məsələ kimi tarixən formalaşmış sənət sahələri haqqında müəyyən məlumatlar əldə etmək mümkündür. Azərbaycan xalqının atalar sözünə əsasən, yardımçı materiallar və müqayisəli təhlillər əsasında əhalinin ənənəvi olaraq hansı sənət növləri ilə məşğul olduğunu müəyyən etmək mümkündür.

Azərbaycan atalar sözünə görə, ölkəmizdə usta-şagird münasibətləri, dəmirçilik, silah-sursat, zərgərlik, dəmirçilik, dərzilik, papaqçılıq, boyaqçılıq, aşılayıcılıq, tikməçilik, xalçaçılıq, toxuculuq, dülgərlik öz təsdiqini tapmış və onların xalqımızın həyatında mühüm yeri olmuşdur.
***Açar sözlər:*** *Azərbaycan, atalar sözləri, sənətkarlıq, sahə, dəmirçilik*

**Shirin Teymur Bunyadova**
Baku State University
Doctor of science in history
shirin_bunyad@mail.ru

## Reflection of crafts in Azerbaijani proverbs

**Abstract**

The presented article is dedicated to the ethnographic study of the types of crafts reflected in Azerbaijani proverbs. One of the steps taken in the direction of the comprehensive study of the science of ethnography is the involvement of examples of oral folk creativity in scientific research. The proverbs included in their composition are important as an auxiliary source. Thus, it is possible to obtain certain information about historically formed art fields from proverbs as a necessary ethnographic issue. Based on the proverbs of the Azerbaijani people, it is possible to determine which types of art the population is traditionally engaged in based on auxiliary materials and comparative analysis.

According to the Azerbaijani proverb, master-apprentice relations, blacksmithing, weapons and ammunition, jewelry, blacksmithing, tailoring, hat making, dyeing, tanning, embroidery, weaving, carpet weaving, weaving, carpentry have been confirmed in our country and they have an important place in the life of our people.
***Keywords:*** *Azerbaijan, proverbs, craft, sector, blacksmithing*

## Giriş

Təqdim edilən məqalə Azərbaycan atalar sözlərində əks olunan sənətkarlıq sahələrinin etnoqrafik tədqiqinə həsr olunmuşdur. Etnoqrafiya elminin hərtərəfli araşdırılması istiqamətində atılan addımlardan biri də şifahi xalq yaradıcılığı nümunələrinin elmi tədqiqata cəlb olunmasıdır. Onların tərkib hissəsi olan atalar sözləri yardımçı mənbə kimi əhəmiyyət kəsb edir. Belə ki, atalar sözlərindən etnoqrafik baxımdan zəruri məsələ kimi tarixən formalaşan sənətkarlıq sahələri haqqında müəyyən qədər məlumat əldə etmək olar. Azərbaycan xalqının atalar sözlərinə əsasən əhalinin ənənəvi olaraq hansı sənət sahələri ilə məşğul olduğunu dəstəkləyici materiallar və

müqayisəli təhlillər əsasında müəyyən etmək mümkündür. Onlarda mövcud sənətkarlıq sahələrinin əks olunması indiyədək etnoqrafiya elmi cəhətdən araşdırılmadığından mövzu aktuallıq təşkil edir.

Atalar sözlərində ümumiyyətlə sənətlə bağlı deyimlərin olması xalqımızın məişətində onun kəsb etdiyi əhəmiyyətdən söz açır. Onlarda sənətə verilən qiymət özünü xüsusilə büruzə verir. Məsələn, «sənət yolda qızıl bilərzikdir», «sənət insanın xəzinəsidir», «sənətin pisi olmaz», «ömür müvəqqətidir, sənət daimi» (Hüseynzadə, 1981: 162). Bu fikirlər həm də özündə xalqın etnik düşüncə tərzini əks etdirir. Belə ki, əsrlər boyu xalqımız sənətkarlara yüksək qiymət vermişdir. Bu cəhət orta əsr Azərbaycan şairləri Nizami Gəncəvi, Məhsəti Gəncəvi, Əfzələddin Xaqani və digərlərinin yaradıcılığında da bütün açıqlığı ilə özünü nümayiş etdirir. Təsadüfi deyildir ki, orta əsrlərdə sənətkar birlikləri (sexləri) olan əxi qardaşlıqları yaranırdı. Sənətkarlar bir ittifaqda birləşirdilər. Onlar cəmiyyət daxilində böyük nüfuza malik olurdular. Hətta şəhərə hörmətli qonaqlar gələn zaman sənətkar birlikləri öz bayraqları altında təmsil olunaraq onların görüşünə çıxırdılar.

Ölkəmiz ərazisində minilliklər boyu insanlar tələbatları olduqları sənət sahələrini qoruyub saxlamışlar və sirrlərini nəsildən-nəsilə ötürmüşlər. Adətən bu sənət sahələri atadan oğula və ya ustadan şagirdə keçirdi. Azərbaycan ərazisində mövcud sənət sahələrinin A.Mustafayev tərəfindən etnoqrafik tədqiqi mühüm əhəmiyyət kəsb edir (Mustafayev, 1999: 440). Əsrlərin təcrübəsi və ənənələrlə bağlı xatırlamalar öz əksini atalar sözlərində də tapmaqdadır.

Atalar sözlərinə sirayət edən məsələlərdən biri usta şagird münasibətləridir. Məlum olduğu kimi, müxtəlif sahələrdə çalışan sənətkarlar öz peşələrini müəyyən məbləğ qarşılığında şagirdlərinə öyrədirdilər. Usta adını almaq üçün şagirdlər yeni məmulatlar düzəltməklə nəyə qadir olduqlarını göstərməyə çalışırdılar. Şagirdlər müstəqil usta kimi fəaliyyət göstərmək üçün şah əsər yaratmalı idilər. Bu tarixi gerçəklik atalar sözlərinə də sirayət etmişdir. Belə ki, bu da «qabil uşaq ustadını keçər» şəklində deyimə çevrilmişdir (Hüseynzadə, 1981: 84). Deməli, şagird gələcəkdə müstəqil çalışmaq üçün müəyyən sınaqdan keçirdi və məhz bundan sonra məharəti bəlli olurdu. Bundan əlavə «şagird ustadını yamsılar», «şagirdin qorxusu ilk məclis aparana kimidir» deyimləri də mövcuddur (Həkimov, 1986: 142). Belə deyimlər onu göstərir ki, bu sənət sahəsində çalışan ustalar öz peşələrinin mahir biliciləri olmuş, onu şagirdlərinə öyrətməyə çalışmışlar. Şagirdlər də imtahan verərək ustalıq adına layiq görülmüşlər.

Azərbaycanda tarixən müxtəlif sənət sahələri mövcud olmuşdur. Onlardan biri dəmirçilik sənətidir. Bu qədim sənət sahəsi haqqında müəyyən xatırlatmalar atalar sözlərində yer almaqdadır. Azərbaycanda dəmirçilik sənətinin olması «kürəyə düşməyən dəmir yumşalmaz» ifadəsində öz əksini tapmışdır (Hüseynzadə, 1981: 150). Deyilən atalar sözlərində dəmirin əridilməsi prosesi şərh edilmişdir. Məlumdur ki, kürə yüksək istiliyin təmin olunması məqsədilə qurulan sobadır. Belə sobalar hava üfürən körük vasitəsilə yüksək temperaturu təmin etmək üçün isti saxlanılırdı. Bu cür kürələr metalişləmənin müxtəlif sahələrində tətbiq olunmuşdur. Onu da əlavə edək ki, Azərbaycanda belə misgərlik kürələrinə Lahıcda indi də rast gəlmək mümkündür.

Məlumdur ki, dəmirçiliklə bağlı sənət sahələrindən biri də silahsazlıq olmuşdur. Silahsazlıq sənətinin varlığı atalar sözlərində yer alan belə ifadələrdən məlumdur: «alət işlər - əl öyünər, qılınc kəsər - qol öyünər» (Hüseynzadə, 1981: 187). Bu deyim hələ qədim dövrlərdə istifadə olunan qılınc barədə onun istehsalı haqqında fikir yürütməyə imkan verir. Bu deyim atalar sözlərinin qədim tarixi olduğunu göstərir. O, qılıncın istifadədə olduğu zamanların deyimləridir ki, indi də eyni mahiyyət kəsb edir. Hətta, «qılınc öz qınını kəsməz» deyimi də deyilənləri təsdiq etməyə imkan verir (Hüseynzadə, 1981: 90). Yeri gəlmişkən onu da qeyd edək ki, mənbələrin təsdiqinə görə orta əsrlərdə Səfəvilər dövründə silahın müxtəlif növlərinin istehsalı o qədər geniş yayılmışdı ki, hətta xarici ölkələrə belə ixrac edilmişdir.

Azərbaycanda əsrlər boyu metalişləmənin bir sahəsi olan zərgərlik sənəti öz inkişafını davam etdirmişdir. Hər bir dövrdə bu sənətlə məşğul olan ustalar müəyyən ənənəvi üsulların tətbiqilə çoxçeşidli nümunələr yaratmışlar. Bunu arxeoloji qazıntılardan əldə olunmuş maddi mədəniyyət nümunələrilə yanaşı, etnoqrafik materiallar da təsdiq etməkdədir. Orta əsr şairlərinin yaradıcılığında müxtəlif zinət əşyalarının adlarına rast gəlməyimiz də təsadüfi deyildir. Bugün də ölkəmizdə istehsal olunan qızıl məmulatları göz oxşayır. Atalar sözlərində bu sənət sahəsi belə ifadələrlə təmsil olunur: «zərgər dükanının tozu qızıl olar», «zər qədrini zərgər bilər» və s. (Hüseynzadə,

1981: 164). Aydındır ki, zinət ustaları zərgərlikdə özünəməxsus ənənə qoyub getmişlər. Bugün də qədim ənənələr əsasında inkişaf etmiş zərgərlik nümunələri varlığını qoruyub saxlayır.

Atalar sözlərində yer alan deyimlərdə sənətkarlıqda istifadə olunan alət və vasitələrin adlarına rast gəlinməsi etnoqrafiya elmi baxımdan maraq doğurur. Məsələn, «zindan olub altda qalmaqdansa, çəkic ol üstə çıx» fikri diqqətəşayandır (Hüseynzadə, 1981: 154). Burada ağır alətlər olan zindan və çəkicdən bəhs edilməsi onların dəmirçilik sahəsində tətbiqindən xəbər verir. Bundan əlavə «qısqı güclü olanda qorxaq bacadan qaçar» - fikrində də qısqının adı çəkilir (Hüseynzadə, 1981: 101). Dilimizdə mövcud olan müxtəlif alətlərin adlarını öyrənmək baxımından da bu məlumatlar müəyyən əhəmiyyət kəsb edir. Dəmirçiliklə bağlı aşağıdakı fikirlər də mövcuddur ki, «dəmiri döyən dəmirçi olar», «dəmiri isti-isti döyərlər», «dəmiri kürədən dəmir çıxardar», «dəmirçi nə bilir qızıl nədir», «kürəyə düşməyən dəmiri yumşaltmaq olmaz» (Hüseynzadə, 1981: 286). Maraqlıdır ki, «bir dəmirdən nal da olar, nizə də» - deyilməsi həm nalbəndlik, həm də silahsazlıq barədə məlumat verir (Hüseynzadə, 1981: 352). Bu deyimlərin daha qədimlərin yadigarı olduğunu qəti söyləmək mümkündür. Təqdim olunan məlumatlar metalişləmə sənətinin varlığını şərh etməyə əsas verir, qədim köklərini isə sübut etməyə arxeoloji qazıntılar mühüm vasitədir.

Azərbaycanda yuxarıda adları sadalanan digər sahələrlə yanaşı, dərziçilik peşəsi də mövcud olmuşdur. İlk olaraq onu qeyd edək ki, hər bir qadın evdəki tələbatla bağlı olaraq tikiş ilə maraqlanırdı. Bu sənət qabiliyyət göstəricisi kimi qadınlara daha çox lazım olurdu. Ona görə də onlar evlərdə asudə vaxtlarında tikiş və toxuma işi ilə mütləq məşğul olurdular. Sonralar isə bu sahədə daha yaxşı dərzilərin meydana çıxması nəticəsində onların rolu artmağa başlamışdı. Həm kişilər, həm də qadınlar iş bölgüsü əsasında müxtəlif paltarlar tikməyə başladılar. Məsələn, kişilər üçün papaq, başmaq, geyim və sair tikənlər kişi dərzilərdən, qadınlar üçün geyim tikənlər isə qadınlardan ibarət olurdu. El arasında da belə ifadələr yayılmağa başladı ki, «dərzi öz yırtığını yamamaz», «dərzi öz soukyünü tikə bilməz», «dərziyə köç dedilər, iynəsini yaxasına sancdı», «dərzinin mayası iynə-sapıdır» (Hüseynzadə, 1981: 164). Bundan əlavə «məsləhətlə tikilən don gen olar» - deyimi də vardır (Hüseynzadə, 1981: 49). Bütün bu deyimlər heç şübhəsiz, məişətdəki müşahidələr nəticəsində ərsəyə gəlmişdir.

Qeyd etməliyik ki, sənətkarlıqda gedən ixtisaslaşma nəticəsində xeyli sayda yeni-yeni sənət sahələri formalaşırdı. Onlardan biri də papaqçılıq idi. Papağın Azərbaycanda xüsusi əhəmiyyət kəsb etməsi məlum məsələdir. Hətta elimizin obamızın ünsiyyətində kişilərdən söhbət gedəndə bütün dövrlərdə «başıpapaqlı» kəlməsi işlənmişdir. Nalayiq hərəkət görüləndə qarşılığında deyilən söz «papağını yerə soxdu» ifadəsi şəklindədir. Göründüyü kimi, papağa verilən qiymət namusla bərabərləşdirilmişdir. Atalar sözlərində belə deyilir: «başı açığın qaçmaq yeri - papaqçı dükanı» (Hüseynzadə, 1981: 175). Bundan əlavə «papaqçının papağı olmaz» ifadəsində bu peşə ustasının özünə vaxtının çatmadığı vurğulanır (Hüseynzadə, 1981: 218). Deməli, Azərbaycan cəmiyyətində başı açıq görünmək məsləhət bilinmirdi ki, papaq üçün dükana müraciət olunurdu. El arasında papaq namus, qeyrət rəmzi sayılıb. Buna görə də «papaq isti-soyuq üçün deyildir, namus üçündür» - deyimi əmələ gəlib (Hüseynzadə, 1981: 217). Odur ki, ona xüsusi məna çaları yükləndiyindən papağa münasibət də başqa əşyalardan daha fərqli olub. Yeri gəlmişkən xatırladaq ki, papaqçılıqla kişi ustaları məşğul olublar. Bu sənəti indi də davam etdirənlər (məsələn, Şəkidə) vardır.

Azərbaycanın əksər bölgələrində təsərrüfat həyatında qoyunçuluq aparıcı sahələrdən biri olmuşdur. Bu da onun yunundan istifadəni labud edirdi. Məişət tələbatının ödənilməsində yun məmulatlarındın istifadə mühüm əhəmiyyət kəsb etmişdir. Xüsusilə yun ipin və ipəyin boyanması üçün boyaqçılıq sənətinə ehtiyac olmuşdur. Sənətin adına atalar sözlərində bu şəkildə rast gəlmək mümkündür: «boyaqçının kürkü boyasız olar» (Hüseynzadə, 1981: 219). Ümumiyyətlə, təbii boyalardan ipin müxtəlif rənglərə boyadılmasında istifadə edilmişdir. Xüsusən xalçaçılıq məmulatlarının ərsəyə gəlməsində boyaqçılıq sənəti mühüm əhəmiyyət kəsb etmişdir. Bildiyimiz kimi, Azərbaycan ərazisində xeyli sayda bitkilərin yetişməsi onlardan boyaq məqsədilə istifadə olunmasını təmin etmişdir. Bundan əlavə ticari əlaqələr vasitəsilə də başqa ölkələrdən boyaq bitkiləri gətirilmişdir. Məsələn, Hindistan ərazisindən gələn indiqo bitkisindən göy rəngin müxtəlif çalarlarının alınmasında istifadə olunmuşdur.

Xalq arasında yayılan deyimlərdən biri də «kürkçünün kürkü olmaz, börkçünün börkü» şəklindədir (Hüseynzadə, 1981: 136). Burada başqa fikir mənalandırılsa da, etnoqrafik baxımdan nəzər-diqqəti cəlb edən məsələ kürkçülüyün ayrıca ixtisaslaşmış bir sənət sahəsi kimi formalaşmasıdır. Qış aylarının ən mühüm geyim növü olan kürk bədənin istiliyini saxlayan vasitə kimi soyuq havalarda istifadə olunaraq əhəmiyyət kəsb etmişdir. Odur ki, bu peşə ayrıca bir sahəyə çevrilmişdir. Bu da sənətkarlıqda ixtisaslaşmanın göstəricisidir.

Xalqımızın məişətində nəqliyyat vasitəsi kimi arabaların və onlara qoşulan atların əhəmiyyəti böyük olduğundan bununla bağlı bir sıra sənət sahələri meydana gəlmişdir. Odur ki, nalbəndlik sənətilə məşğul olan ustaların fəaliyyətinə böyük ehtiyac duyulmuşdur. Bununla bağlı da zarafatyana deyilən belə kəlmələr yaranırdı ki, «kor atın axsaq nalbəndi olar» (Hüseynzadə, 1981: 113). Ümumiyyətlə, at ləvazimatlarının düzəldilməsi ilə bağlı olan sənət sahəsi sərraclıq adlanır. Bu sənət növü barədə ətraflı məlumat verilmişdir (Mustafayev, 2002: 442-448). Atalar sözlərində xeyli sayda at ləvazimatlarının adlarına rast gəlməyimiz onu göstərir ki, nəqliyyat vasitəsi kimi araba düzəldilməsi yerli istehsalla bağlı olmuşdur. Bunu etnoqrafik materiallar da sübuta yetirir. Qeyd etmək yerinə düşər ki, sərraclığın özündə də ixtisaslaşma gedir və qaltaqçılar, təkaltı ustaları, palanduzlar meydana çıxır.

Sənət sahələrindən biri kimi ağacişləmə sənətinin varlığı ağacdan müxtəlif məmulatların hazırlanmasında özünü büruzə verir. Tarixən ağacdan nəinki ev tikintisində, həmçinin müxtəlif məişət əşyalarının hazırlanmasında, musiqi alətlərinin düzəldilməsində və s. sahələrdə istifadə edilmişdir. Atalar sözlərində deyilir: «quru ağacı odunla kəsərlər» (Hüseynzadə, 1981: 136). Bundan əlavə baltanın adı çəkilir (Hüseynzadə, 1981: 125). Eyni zamanda atalar sözlərində ağacişləmə sənəti ilə bağlı o qədər məişət əşyasının adına rast gəlmək olur ki, bu da əhalinin həyatında onlara tələbatın olduğunu və ağacişləmə sənətinin geniş yayıldığını göstərir. Məsələn, «meşədə ağacın düzünü seçərlər» (Hüseynzadə, 1981: 284). Bu o deməkdir ki, əsaslı məmulatların hasil olunması üçün yaxşı və düz ağac nümunələri lazımdır ki, ondan keyfiyyətli məhsul əldə edilə bilinsin. Bundan əlavə deyimlərdə qeyd olunur ki, «bir ağacdan bel də olar, kürək də» (Hüseynzadə, 1981: 352). Yəni, ağacdan müxtəlif məişət əşyaları düzəltmək mümkündür. Bildiyimiz kimi, bir sıra təsərrüfat alətləri (bel, yaba, oraq, kərənti və s.) vardır ki, onların sapı ağacdan hazırlanır.

Başqa sənət sahələrində olduğu kimi, ağacdan müxtəlif məmulatlar hazırlayan sənətkarlar arasında da ayrı-ayrı peşələr üzrə ixtisaslaşmış ustalar gördükləri işlərilə fərqlənirdilər. Uzun əsrlər boyu qazandıqları təcrübəni hazırladıqları müxtəlif məmulatlar üzərində məharətlə əks etdirə bilirdilər. Bu ondan irəli gəlir ki, sənətkarlar həm ağacların xassələrini yaxşı öyrənmişdilər, həm öz peşələrinə mükəmməl yiyələnmişdilər, həm də məmulatın keyfiyyətli olmasında maraqlı idilər. Ağacın kəsilməsi payızdan qışın sonunadək olan dövrü əhatə edirdi. Aydın məsələdir ki, hər sənət növündə olduğu kimi, ağacişləmədə də materialın seçilməsi mühüm əhəmiyyət kəsb edir. Ağacın hamar və düyünsüz olması onun keyfiyyətinə dəlalət edir. Orta əsrlərdə ağaişləmə sənəti barədə təfsilatlı məlumatlara rast gəlinir (Bünyadova, 2007: 242-256). Bu tədqiqatda müxtəlif mənbələr əsasında həmin sənətin əhəmiyyəti vurğulanır.

El arasında ünsiyyətdə tez-tez istifadə olunan «mən onun dabbaqda gönünə bələdəm» ifadəsi başqa məzmun kəsb etsə də, dabbaqçılıq sənəti və bununla bağlı gön aşılama prosesi haqqında söz açır. Məlumdur ki, hələ qədim dövrlərdə «qaşıma, sıyırma, hamarlama, döyəcləmə, ütmə, piyləyib yumşaltma və s. işləməklə kifayətlənməyib qədim insanlar dərini mexaniki üsullarla, onun bəsit aşılama texnikasına da müəyyən qədər yiyələnibmişlər» (Mustafayev, 2002: 406). Pinəçilik sənəti ayaqqabı istehsalının tərkib hissəsidir. Atalar sözlərində pinəçi barədə məlumat verilir (Hüseynzadə, 1981: 224). Yeri gəlmişkən xatırladaq ki, müasir dövrdə İçərişəhər sakini Əli Rzayev bu sahədə çalışan nadir ustalardan biridir.

Müxtəlif məişət növlərinin (çuxa, cübbə, pul kisəsi, köynək) adlarına atalar sözlərində rast gəlinməsi tikmə və toxuma peşələrinin olduğundan xəbər verir. Bildiyimiz kimi, tarixən toxuculuq məmulatları Azərbaycan xalqının məişətində xüsusi yerə malikdir. Məişətin müxtəlif sahələrində ondan istifadə olunması və mühüm əhəmiyyət kəsb etməsi atalar sözlərinə də sirayət etmişdir. Xalça (220), kilim (49), palaz (219), çuval (76), çul (333) sözlərinə rast gəlinməsi qədim ənənələrə malik xalçaçılıq sənətinin davamlı inkişafını göstərir. Bu barədə C.Mustafayevin verdiyi məlumatlar da maraq doğurur. Müəllif xanlıqlar dövründə sənət sahələrinin inkişaf səviyyəsini

tədqiq edərkən bu barədə xeyli məlumat vermişdir (Mustafayev, 2002: 272). Bundan əlavə həsirçiliyin olduğu «bir həsirdir, bir də Məmməd Nəsir» deyimi vasitəsilə təsdiqlənir.

## Nəticə

Yekun olaraq onu deyə bilərik ki, atalar sözləri mühüm mənbə qismində olduqca dəyərli material təqdim edir. Əlbəttə onu nəzərə almaq lazımdır ki, çoxsaylı atalar sözlərində xeyli məişət əşyalarının adlarına rast gəlməyimiz onların əksəriyyətinin yerli istehsalla bağlı olduğunu söyləməyə əsas verir. Çünki bunu nəinki folklor nümunələri, çoxsaylı müəlliflərin yaradıcılığındakı materiallar, eyni zamanda arxeoloji qazıntılar, etnoqrafik müşahidələr də təsdiq etməkdədir. Qeyd olunan atalar sözlərinə əsasən Azərbaycanda tarixən formalaşan və ixtisaslaşma gedən sənət sahələri haqında məlumat almağın mümkünlüyü və bunun etnoqrafik əhəmiyyəti açıq aşkar qeyd edildi. Azərbaycan xalqının məişət həyatında mühüm rol oynayan məişət əşyalarının ərsəyə gəlməsində ayrı-ayrı sənət sahələrinin rolu təsdiqləndi. Bu məsələdə atalar sözlərinin verdiyi özünəməxsus töhvə vurğulandı (8).

## Ədəbiyyat

1. Atalar sözü (top. Ə.Hüseynzadə). (1981). Bakı, Yazıçı, 336 s.
2. Mustafayev, A.N. (1999). Azərbaycanda sənətkarlıq (tarixi etnoqrafik-tədqiqat). Bakı, Altay, 440 s.
3. Azərbaycan etnoqrafiyası. (2007). Üç cilddə. I cild. Bakı, “Şərq-Qərb”, 544 səh.
4. Bünyadova, Ş. (2007). Azərbaycanın təsərrüfatı və maddi mədəniyyəti. XII-XVI əsrlər. Bakı, Elm, 360 s.
5. Mustafayev, C. (2002). Xanlıqlar dövründə Azərbaycanda sənətkarlıq. Bakı, Elm, 272 s.
6. Sözlü, nağıllı gecələr (toplayıb tərtib edən Loğman Ağalı). (1991). Bakı, İşıq, 120 s.
7. Xalqımızın deyimləri və duyumları (Tərtibatçı M.İ.Həkimov). (1986). Bakı, Maarif, 392 s.
8. http://medeniyyet.nakhchivan.az/mtbuat-xidmti/xbrlr/1316-2020-06-19-07-16-28.html

Göndərildi: 19.01.2020 Qəbul edildi: 28.03.2020

DOI: 10.36719/2706-6185/02/9-12

**Ələmdar Əli oğlu Şahverdiyev**
Bakı Dövlət Universiteti
tarix elmlər namizədi
aynaz1@mail.ru

# AVROPANIN ENERJİ TƏHLÜKƏSİZLİYİNDƏ AZƏRBAYCANIN ROLU

**Xülasə**

Avropanın enerji təhlükəsizliyi hər bir Avropa ölkəsi siyasətinin mühüm hissəsidir. Bu siyasətin strateji məqsədi enerji asılılığının işıqlandırılmasını ehtiva edir və hər bir Avropa ölkəsi üçün enerji təhlükəsizliyini təmin edir. Məqalədə Avropanın enerji təhlükəsizliyinin əsas komponentləri, bu sahədə əsas strateji məqsədlər, gözlənilən orta və uzunmüddətli problemlər, həmçinin fəaliyyət istiqamətləri, Azərbaycanın müasir reallıqlarda Avropanın enerji təhlükəsizliyini təmin etmək imkanları təhlil edilməyə çalışılır. Enerji daşıyıcılarına tələbatın illər üzrə artım dinamikası və dünyada baş verən siyasi proseslər kontekstində tələb və təklif proporsiyalarının proqnozlaşdırılmasının mürəkkəbliyi və davamlı enerji təchizatında problemlər enerji təhlükəsizliyi məsələsini dünya ölkələri üçün bir daha aktuallaşdırır

***Açar sözlər:*** *enerji təhlükəsizliyi, enerji səmərəliliyi, şaxələndirmə, boru kəməri*

**Alamdar Ali Shahverdiyev**
Baku State University
candidate of history
aynaz1@mail.ru

## Role of Azerbaijan in European energy security

**Abstract**

European energy security is an important part of the policy of every European country. The strategic objective of this policy includes the illumination of energy dependence and ensures energy security for every European country. The article tries to analyze the main components of Europe's energy security, the main strategic goals in this field, the expected medium and long-term problems, as well as directions of action, Azerbaijan's opportunities to ensure Europe's energy security in modern realities. The dynamics of the growth of demand for energy carriers over the years and the complexity of forecasting the proportions of demand and supply in the context of the political processes taking place in the world and problems in sustainable energy supply make the issue of energy security once again relevant for the countries of the world

***Keywords:*** *energy security, energy profitability, diversification, pipeline*

## Giriş

Təbiidir ki, enerji təhlükəsizliyi hər bir ölkənin stabil fəaliyyəti və inkişafının təmin edilməsi üçün həlledici amillərdəndir. Məhz bu səbəbdən Avropa ölkələrinin dövlət siyasətinin əsas istiqamətlərindən biri də Avropa İttifaqının enerji təhlükəsizliyidir. Enerji təhlükəsizliyinin təmin edilməsi sahəsində yeni strategiya çərçivəsində Avropa İttifaqı ölkələrinin məhdud sayda enerji təchizatçılarından asılılığının azaldılmasına, enerji təchizatı mənbələrinin, təminetmə marşrutlarının genişləndirilməsinə, habelə, neft və qaz ehtiyatlarının artırılmasına zəmin yaradan enerji vektorlarının şaxələndirilməsi istiqamətində fəaliyyətin gücləndirilməsi prioritetlər siyahısındadır.

Bununla yanaşı, enerji daşıyıcılarına tələbatın illər üzrə artım dinamikası və dünyada baş verən siyasi proseslər kontekstində tələb və təklif proporsiyalarının proqnozlaşdırılmasının mürəkkəbliyi və davamlı enerji təchizatında problemlər enerji təhlükəsizliyi məsələsini dünya ölkələri üçün bir daha aktuallaşdırır. Bu reallıqlar Avropa regionu üçün xüsusilə spesifikdir və kontinent ölkələri üçün alternativ enerji istehsalçılarına çıxış mühüm strateji məqsədlərdəndir. Bu alternativlər sırasında Xəzər regionu, xüsusilə Azərbaycan böyük önəm daşıyır (Azərbaycan Respublikasının milli təhlükəsizlik konsepsiyası, 2007).

Eyni zamanda, enerji resurslarının Avropa bazarlarına çıxması və tranzit imkanlarının gücləndirilməsi Azərbaycan üçün əlavə siyasi, maliyyə, iqtisadi imkanların yaradılması ilə yanaşı bu resurslara sahib olmayan Avropa ölkələri üçün enerji təhlükəsizliyi baxımından əhəmiyyətlidir. Göstərilənləri nəzərə alaraq, Avropanın enerji təhlükəsizliyinin əsas strateji məqamlarının, bu proseslərdə Azərbaycanın əhəmiyyətinin və töhfəsinin araşdırılması aktual mövzulardandır.

Avropanın müasir iqtisadiyyatı üçün təbii qaz, neft və kömür kimi məhdud və bərpa olunmayan resurslar üzrə enerji istehlakının mütəmadi artımı xarakterik haldır. Bu növ təbii enerji resursları ilə Avropa İttifaqının orta hesabla 80 faiz enerji istehlakı təmin edilir və hazırda bu resursların yarıdan çox hissəsi idxal olunur (Местоев, 2015).

İndiki şəraitdə Avropanın enerji təhlükəsizliyinin mövcud vəziyyətini və perspektivlərini özündə əks etdirən kompleks sənədlərdən biri olan "Enerji təchizatının təhlükəsizliyi üçün Avropa Strategiyası üzrə "Yaşıl Sənəd" əsasında aşağıdakı əsas nəticələrə gəlmək mümkündür:

– Avropa İttifaqı xarici enerji mənbələrindən daha çox asılı olacaq və bu ittifaqın genişlənməsi müvafiq vəziyyəti dəyişdirməyəcək. Mövcud proqnozlara əsasən 2030-cu ilə qədər bu asılılıq 70 faizə qədər artacaq;

– Avropa İttifaqında enerji təchizatı vəziyyətinə təsir etmə imkanları məhduddur. O müvafiq vəziyyətə əsasən müxtəlif sahələrdə enerjiyə qənaət yolu ilə tələbin azaldılmasına təsir imkanlarına sahibdir;

2030-cu ilə qədər enerji tələbatı, habelə atmosferə atılan karbon qazları 60 faiz artacaq. 1994-cü illə müqayisədə neftə tələbat 20 faiz artmış, habelə, hər il 1,6 faiz daha da artacağı proqnozlaşdırılır (Надежность Энергоснабжения – зеленая книга европейской комиссии стимулирует дискуссии, 2000).

Adıçəkilən sənəd eyni zamanda Avropa İttifaqının enerji strategiyasının əsas istiqamətlərini də müəyyən edir və onlar aşağıdakılardır:

✓ rəqabətqabiliyyətli daxili enerji bazarının yaradılması və inkişaf etdirilməsi;
✓ enerji resurslarının mənbələrinin və onların çatdırılması marşrutlarının şaxələndirilməsi;
✓ enerjiyə qənaət və enerjidən istifadənin səmərəliliyinin artırılması;
✓ bərpa olunan enerjinin istehsalının həcminin yüksəldilməsi. (Green Paper-A European Strategy for Sustainable, 2006).

Göründüyü kimi, Avropa İttifaqının enerji strategiyasının əsas istiqamətlərindən biri də enerji resurslarının idxalı mənbələrinin şaxələndirilməsidir. Hazırda Avropa İttifaqının müvafiq sahədə məqsədlərindən biri Rusiya, Norveç və Əlcəzair kimi enerji daşıyıcılarının əsas təchizatçılarının inhisar mövqelərinin azaldılmasıdır. Bu sahədə ən miqyaslı layihə Orta Asiyadan enerji daşıyıcılarının Avropaya nəqlini həyata keçirilməsini nəzərdə tutan və bu kontinent ölkələri üçün sığorta rolunu oynayacaq Nabukko layihəsi idi. Lakin regionda baş verən siyasi və iqtisadi proseslər bu layihənin reallaşmasında ciddi problemlər yaratmışdır. Bununla yanaşı, mövcud şərait nəzərə alınaraq Avropa İttifaqı İran və Misir-İordaniya-Suriya qaz boru kəmərləri layihələrinin həyata keçirilməsində maraqlıdır. (Местоев, 2015). Sadalanan məsələlər Azərbaycanın Avropanın enerji təhlükəsizliyində əhəmiyyətinə təsirsiz ötüşmür və real imkanların araşdırılmasını zəruri edir.

Azərbaycan Prezidenti İlham Əliyevin "Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın icrasının ikinci ilinin yekunlarına həsr olunmuş konfransda çıxışı zamanı bildirdiyi kimi: "Cənub Qaz Dəhlizi Avropa üçün enerji təhlükəsizliyi layihəsidir" (Azərbaycan Prezidenti İlham Əliyev "Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"). Bununla yanaşı, regionda və qlobal məkanda energetika sahəsində Azərbaycanın durmadan artan nüfuzu və imkanları, ölkəmizin Asiya və

Avropa arasında enerji körpüsü rolunun bir daha nümayiş etdirilməsi potensialına malik olduğu və Avropanın enerji təhlükəsizliyində mühüm rol oynadığı beynəlxalq səviyyədə dəfələrlə vurğulanmışdır. Belə ki, ABŞ administrasiyasının bildirdiyinə görə enerji daşıyıcılarının Azərbaycandan idxal edilməsi digər mənbələrdən asılı olan Avropa istehlakçılarının enerji təhlükəsizliyinin təmin edilməsi baxımından çox vacibdir. ABŞ Dövlət Katibinin Avrasiya enerji məsələləri üzrə keçmiş nümayəndəsi və ABŞ-ın Azərbaycandakı keçmiş səfiri Riçard Morninqstarın sözlərinə görə Azərbaycan qazı cənub dəhlizinin inkişafı üçün mütləq əhəmiyyətlidir (Ratner, Belkin, Nichol, Woehrel, 2013).

Bununla yanaşı, 2016-cı ilin iyul ayında Varşavada keçirilmiş NATO-nun zirvə toplantısında enerji təhlükəsizliyi çərçivəsində Trans-Anadolu (TANAP) və “Trans-Adriatik” (TAP) qaz boru kəmərləri müzakirə edilmişdir. Bu toplantı ilə bağlı NATO-nun enerji təhlükəsizliyi bölməsinin rəhbəri Mişel Ruehle öz şərhində enerji təhlükəsizliyinin NATO-ya üzv ölkələr üçün əhəmiyyətli olduğunu bildirərək, üzv ölkələrin Rusiya qazından asılılığının azaldılmasının əsas müzakirə mövzusu olduğunu və məhz bu səbəbdən TANAP və TAP layihələrinin Avropaya enerji təchizatının şaxələndirilməsi baxımından zəruriliyini vurğulamışdır (Budaqov, 2016).

Qeyd edək ki, Türkiyə və Azərbaycan arasında 2011-ci ildə Azərbaycan ərazisindən nəql olunan təbii qazın Türkiyə ərazisindən tranzit nəqli üçün tikiləcək “Müstəqil Boru Kəməri”nin inşasına dair qarşılıqlı Anlaşma Memorandumu, 2012-ci ildə isə “Trans-Anadolu Təbii Qaz Boru Kəməri” layihəsinə dair Saziş imzalanmışdır (2013-cü ildə sənaye və yanacaq-energetika kompleksi üzrə görülmüş işlər barədə Hesabat, 2013). Xəzərin Azərbaycan sektorundakı “Şahdəniz-2” yatağından çıxarılan qazı Türkiyəyə və bu ölkədən Avropaya nəql edəcək TANAP-ın uzunluğu (19 kilometri Mərmərə dənizindən keçməklə) ümumilikdə 1850 kilometr olacaq (Budaqov, 2016). Dörd mərhələdə həyata keçiriləcək layihənin ilk mərhələsinin 2018-ci ildə yekunlaşdırılması nəzərdə tutulur. 2020-ci ildə kəmərin buraxılış qabiliyyəti ildə 16 milyard kubmetrə, 2023-cü ildə 23 milyard kubmetrə, 2026-cı ildə isə 31 milyard kubmetrə çatdırılacaqdır. TANAP layihəsi üzrə nəql olunacaq 16 milyard kub metr Azərbaycan qazının 10 milyard kub metri Avropaya, 6 milyard kub metri isə Türkiyəyə satılması planlaşdırılır (Trans-Anadolu qaz boru kəmərinin təməli qoyulub, 2015). TANAP Cənubi Qafqaz Boru Kəmərindən (CQBK) alacağı təbii qazı 2020-ci ilin əvvəlindən etibarən TAP qaz boru kəmərinə qoşularaq Yunanıstan, Albaniya və İtaliyadan keçməklə Avropaya çatdıracaqdır (2013-cü ildə sənaye və yanacaq-energetika kompleksi üzrə görülmüş işlər barədə Hesabat, 2013). Bu layihələrin reallaşması Trans-Xəzər qaz kəmərinin gerçəkləşməsi üçün də yeni imkanlar yaradacaqdır. Qazaxıstanın və Türkmənistanın gələcəkdə bu layihəyə qoşulacağı təqdirdə Azərbaycan, həm də, qaz nəqlində mühüm tranzit ölkəyə çevriləcək və Şərq-Qərb enerji dəhlizinin formalaşmasında rolu daha da artacaqdır.

07.11.2006-cı il tarixində Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin Brüsselə səfəri zamanı imzalanmış “Avropa İttifaqı ilə Azərbaycan Respublikası arasında enerji sahəsində strateji tərəfdaşlıq haqqında Anlaşma Memorandumu” Azərbaycanla Avropa İttifaqı arasında enerji təchizatının şaxələndirilməsi və təhlükəsizliyi, həmçinin Azərbaycanın enerji infrastrukturunun inkişafı və müasirləşdirilməsi, enerjidən səmərəli istifadə, enerjiyə qənaət və bərpa olunan enerji mənbələrinin istifadəsi məqsədilə enerji dialoqunun genişləndirilməsi istiqamətində yeni imkanlar yaratmışdır. Bununla yanaşı, beynəlxalq səviyyəli enerji layihələrinin həyata keçirilməsi ölkə üçün investisiya, davamlı gəlirlər və əhalinin həyat səviyyəsinin təmin olunması ilə yanaşı, müxtəlif beynəlxalq əməkdaşlıq platformalarında Avropanın enerji təhlükəsizliyinin təmin edilməsində Azərbaycanın töhfəsinin artırılmasına xidmət etmişdir. Ölkəmizdə hasil olunan enerji məhsullarının Avropa ölkələrinə nəql edilməsi istiqamətində müvafiq layihələr həyata keçirməsi, bu layihələrin mərhələlərlə tam həlli istiqamətində geniş miqyaslı əməkdaşlıq davam etdirməsi, Bakı-Tbilisi-Ceyhan ixrac neft kəməri vasitəsilə neftin ixracı, Bakı-Tbilisi-Ərzurum Cənubi Qafqaz Boru Kəmərinin istismara verilməsi, yeni enerji dəhlizlərinin yaradılması təşəbbüsü Azərbaycan Prezidenti cənab İlham Əliyev tərəfindən qətiyyətlə müdafiə olunmuş və dövlət başçısı enerji təchizatının şaxələndirilməsi siyasətinin tərəfdarı olduğunu dəfələrlə bəyan etmişdir. Qeyd edək ki, Azərbaycan üçün ixrac və tranzit imkanlarının genişləndirilməsi, Avropa üçün idxal mənbələrinin

şaxələndirilməsi bütövlükdə bu ölkələrin enerji təhlükəsizliyinin təmin olunması baxımından vahid məqsəd təşkil edir.

## Nəticə

Göstərilənlərlə yanaşı ən mühüm töhfələrdən biri Cənub Qaz Dəhlizinin icrası istiqamətində çox önəmli addımların atılmasıdır. Bu layihə ümumilikdə dörd layihədən ibarətdir (Şahdəniz, Cənub Qafqaz Kəməri, TANAP, TAP) və qeyd olunan hər bir layihə üzrə işlər uğurla icra edilir (Azərbaycan Prezidenti İlham Əliyev "Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı").

Yuxarıda qeyd olunan məsələlər bir daha bunu deməyə əsas verir ki, Azərbaycanın Avropanın enerji təhlükəsizliyində rolu böyükdür və regionda bu sahədə həyata keçirilən iri layihələr Avropa üçün yeni həyati və təhlükəsiz enerji mənbələrinə çıxış imkanlarını yaradacaqdır.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının milli təhlükəsizlik konsepsiyası. Azərbaycan Respublikası Prezidentinin 2007-ci il 23 may tarixli, 2198 nömrəli Sərəncamı ilə təsdiq edilmişdir. http://www.e-qanun.az/ framework/13373.
2. Azərbaycan Prezidenti İlham Əliyev "Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın icrasının ikinci ilinin yekunlarına həsr olunmuş konfransda çıxışı. http://www.president.az/articles/17692.
3. Europe's Energy Security. (2013). Options and Challenges to Natural Gas Supply Diversification. Michael Ratner, Paul Belkin, Jim Nichol, Steven Woehrel. Congressional Research Service. August 20.
4. Budaqov, N. (2016). TANAP və TAP layihələri NATO-nun zirvə toplantısında əsas müzakirə mövzusu olacaq. AZƏRTAC. Bakı, 22 iyun.
5. Nadezhnost Energosnabzheniya – zelenaya kniga yevropeyskoy komissii stimuliruyet diskussii. Byulleten MAGATE. 42/4/2000.
6. Mestoyev, R.A. (2015). Opyt yevropeyskogo soyuza v obespechenii energeticheskoy bezopasnosti. Sovremennyye problemy nauki i obrazovaniya. Sentyabr 16, № 1-2.
7. Green Paper-A European Strategy for Sustainable, Competitive and Secure Energy. (2006). Commission of the European Communities. Brussels, 8.3.2006 COM. 105 final.
8. 2013-cü ildə sənaye və yanacaq-energetika kompleksi üzrə görülmüş işlər barədə Hesabat. (2013). Azərbaycan Respublikası Energetika Nazirliyi. http://minenergy.gov.az/db/Hesabat/Illik%20 hesabat% 202013%20.pdf.
9. Trans-Anadolu qaz boru kəmərinin təməli qoyulub (18.03.2015). http:www.myvideo.az/v/198208/; http: www.1news.az/chronicle/20150317072707068/html

Göndərildi: 12.07.2020 Qəbul edildi: 21.09.2020

DOI: 10.36719/2706-6185/02/13-20

**Андрей Вячеславович Сызранов**
Астраханский Государственный Архитектурно-Строительный Университет
кандидат исторических наук
andrey.sizranov@mail.ru

# СЕВЕРОКАВКАЗСКИЙ МУСУЛЬМАНСКИЙ ФАКТОР В АСТРАХАНСКОЙ ОБЛАСТИ В КОНЦЕ XX - НАЧАЛЕ XXI ВВ

**Резюме**

Статья посвящена изучению роли северокавказского мусульманского фактора в Астраханской области в конце XX - начале XXI вв. Делается вывод о том, что сокращение численности традиционных групп населения на фоне мощного миграционного потока за последние два-три десятилетия (особенно с Северного Кавказа) меняет этническую ситуацию в регионе и межэтнический баланс в сторону мигранты. Во многом именно в связи с притоком мигрантов с Северного Кавказа в Нижнее Поволжье в конце XX века в регион стали проникать идеи радикального ислама.

***Ключевые слова:*** *Астрахань, ислам, мусульмане, мигранты, салафизм, Северный Кавказ, суфизм*

**Andrey Vyacheslavovich Syzranov**
Astrakhan State University of Architecture and Civil Engineering
candidate of historical sciences
andrey.sizranov@mail.ru

# The North Caucasian Muslim factor in the Astrakhan region in the late XX - early XXI centuries

**Abstract**

The article is devoted to the study of the role of the North Caucasian Muslim factor in the Astrakhan region in the late XX - early XXI centuries. It is concluded that the reduction in the number of traditional population groups against the backdrop of a powerful migration flow over the past two or three decades (especially from the North Caucasus) is changing the ethnic situation in the region and the interethnic balance in the direction of migrants. In many respects, it was due to the influx of migrants from the North Caucasus to the Lower Volga region at the end of the 20th century that the ideas of radical Islam began to penetrate the region.

***Keywords:*** *Astrakhan, Islam, muslims, migrants, salafism, North Caucasus, sufism*

## Введение

Астраханская область - один из уникальных полиэтничных регионов Юра России. Наряду с геополитическим, транспортным, экономическим значением, Нижневолжье и по сей день остаётся образцом межэтнического и межконфессионального спокойствия, толерантности и взаимного этно-сотрудничества. Нижнее Поволжье издревле являлось перекрёстком путей и «вратами народов», регионом открытых этнических и культурных миграций. Есть мнение, что Астраханский край представляет особую историко-географическую зону на стыке трёх историко-этнографических областей: Северо-Кавказской, Центрально-Азиатской (или Среднеазиатской) и Средне-Волжской (Викторин, 1989: 18-22). Поэтому регион всегда был местом, где жили представители самых разных народов и конфессий.

Так, во времена Хазарского каганата (VII-X вв.) здесь жили собственно хазары, булгары, аланы, арабы, евреи, славяне и др., которые исповедовали языческие верования, ислам, христианство, иудаизм. Каждый из этих народов мог свободно совершать свои религиозные обряды и производить судопроизводство по своим обычаям (Плетнёва, Хазары, 1976: 58-59;

Новосельцев, 1990: 131-153). Такое же этнокультурное разнообразие сохранялось и во времена Золотой Орды (XIII-XV вв.), Астраханского ханства (вторая половина XV - первая половина XVI вв.), Астраханского воеводства, а затем и губернии (с 1717 г.). Известно, например, что уже в первые века существования русской Астрахани (после её основания в 1558 г.) в городе, наряду с православными храмами, были построены мусульманские мечети, армяно-григорианские церкви, католический костёл, лютеранская кирха, даже индуистская кумирня. Веротерпимость, царившая в южном форпосте государства Российского, особенно поражала иностранцев, побывавших здесь. Так, в конце XVIII в. Астрахань посетил известный польский писатель и путешественник Ян Потоцкий (1761-1815). Вот как он описывает религиозную ситуацию в городе: «Самое большое впечатление произвела на меня веротерпимость, какую, может быть, чрезвычайно трудно найти на каком-нибудь другом месте земного шара. Последователи Али (т.е. мусульмане-шииты. -А.С.), проклиная в своих караван-сараях приверженцев секты Омара (т.е. мусульман-суннитов -А.С.), могут слышать, как призывают на молитву крики муэдзинов сих последних, колокола греческой (т.е. православной. - А.С.) церкви, тамтам индейцев (индийцев-индуистов. -А.С.) и, может быть, жужжание лам (буддийских священнослужителей. -А.С.). К этим разным религиям можно присовокупить несколько сект староверцев, и все европейские и азиатские христианские общества» (Заходер, 1996: 356-372).

Народы, населяющие Астраханский край, всегда проявляли уважение друг к другу, к чужим обычаям и традициям, готовность вместе противостоять общей беде. И сегодня, в условиях новых вызовов единству Российской Федерации и народов, её населяющих, астраханцы по-прежнему демонстрируют стремление к миру и согласию.

Заселение территории современной Астраханской области началось в глубокой древности. К концу XVIII - началу XIX в. окончательно сформировался преобладающий и по сей день национальный состав края, представленный, прежде всего, носителями индоевропейских (русские, украинцы и др.) и алтайских (казахи, татары, ногайцы, калмыки и др.) языков. К этому времени сложились и основные хозяйственно-культурные типы: морские рыболовы и охотники на морского зверя (русские-ловцы Каспийского взморья), рыболовы волжской дельты (русские), пашенно-плужные земледельцы (русские), земледельцы-овощеводы (русские и татары), кочевники (казахи и калмыки) и полукочевники (ногайцы-карагаши и туркмены).

Спустя два столетия, на рубеже XX-XXI вв., в Астраханской области наблюдается значительный прирост мигрантов с Кавказа и из Средней Азии: аварцев, даргинцев, лезгин, чеченцев, ингушей, кумыков, азербайджанцев, узбеков, таджиков и др. И наоборот, падает численность традиционных, «коренных» народов: русских, татар, украинцев, белорусов. Основные предполагаемые причины: низкая рождаемость, высокая смертность, отток населения в другие регионы. Также сокращается численность немцев и евреев – в основном, за счёт эмиграции в Германию и Израиль. Только один нижневолжский этнос-казахи,несмотря на кризисные 1990-е годы, сохранил динамику неуклонного роста (при сокращении, однако, темпов).

С эпохи «перестройки» в СССР началось т.н. «национальное возрождение». Этот процесс затронул и многонациональное население Астраханской области. Выразилось это, прежде всего, в возникновении целого ряда национально-культурных обществ, ставящих своей главной задачей возрождение родного языка и культуры: татарское «Дуслык» («Дружба»), казахское «Жолдастык» («Товарищество»), ногайское «Бирлик» («Единство»), армянское «Арев» («Солнце») и др. Стали регулярно отмечаться национальные праздники: русские Масленица, Зеленые Святки, Дни Славянской письменности и культуры, татарский Сабантуй, калмыцкий Цаган Сар, тюрко-иранский Наурыз, или Навруз. Некоторые общества стали издавать свои газеты (татарская «Идель» («Волга»), казахская «Ак Арна» («Чистый родник»), «Немецкое Астраханское обозрение» и др.). В ряде образовательных учебных заведений области общего, среднего и высшего уровней начали преподаваться национальные языки (казахский, татарский, ногайский, калмыцкий и др.).

Население Астраханской области на сегодняшний день (по переписи 2010 г.) немного превышает 1 млн. чел. В регионе представлены более 140 этносов и этнических групп. Преобладающее население – русские (67,6 %), казахи (14,9 %) и татары (6 %). Современное население принадлежит к следующим языковым семьям: индоевропейской (русские, украинцы,

белорусы, армяне, таджики, цыгане и др.), алтайской (казахи, татары, ногайцы, туркмены, азербайджанцы, узбеки, турки, кумыки, чуваши, калмыки и др.), кавказской, или северокавказской (аварцы, даргинцы, лезгины, чеченцы, грузины и др.), уральской (мордва, марийцы и др.). На территории региона проживают представители наций как дореволюционного (русские, украинцы, татары-переселенцы), так и советского (казахи) периодов формирования, народностей (ногайцы, цыгане и др.) и субэтнических групп (липоване, юртовцы и др.).

Общая численность русского населения составила 618 204 человека, сократилась по сравнению с 2002 г. на 82356 человек или на 12 %. Доля русского населения также сокращается. Если в 1989 г. их доля составляла 71,9 % (173 558 чел.), в 2002 г. - 69,6 % (700 561 чел.), то в 2010 г. - 67,6 %. (618 204 чел.). Казахов насчитывается 149 415 человек (в 2002 г. их численность составляла 142 633 человека). На первый взгляд имеется значительная положительная динамика, но в тоже время есть некоторое сокращение темпов роста казахского населения, что связано с сокращением темпов рождаемости и миграцией. Еще более стремительная тенденция сокращения численности наблюдается у татар. В 2002 г. - 7 2617 человек, они составляли 7,2 % от общего числа жителей области, а в 2010 г. - 60 523 человека или около 6 %. Сокращение за 8 лет составило 14,3 %. Сократилась численность ряда других национальностей: вся славянская группа, калмыки, евреи, немцы, народы Закавказья, осетины, чеченцы. Четвертую по численности совокупную этническую группу в регионе составляют народы Дагестана - 16 882 человека. Следует отметить увеличение численности ногайцев. По сравнению с результатами переписи 2002 г. (4 570 человек) наблюдается рост в 66 % (7 589). Это связано, в основном, переселением в регион северокавказских ногайцев-мигрантов и развитием этнического самосознания астраханских ногайских этнических групп (Алексеев, 1936: 209).

Таким образом, сокращение численности традиционных групп населения на фоне мощного миграционного потока последних двух-трех десятилетий (особенно, с Северного Кавказа) меняет этническую ситуацию в регионе, межнациональный баланс в сторону мигрантов.

Миграционные процессы в регионе привели к конкуренции за доминирование в ряде отраслей народного хозяйства (строительство, сельское хозяйство, торговля) между различными национальными группами - «местными» и пришлыми. Борьба за ресурсы (бизнес, рабочие места рынки сбыта и т.д.) в некоторых аспектах приобретает национальный характер. Северокавказские мигранты активно осваивают местный рынок жилья. Ими приобретаются компактно расположенные земельные участки (для индивидуальной застройки) и старые дома (для реконструкции). Яркий пример – улица Бакинская и находящиеся рядом улицы и переулки, которые расположены в районе городского рынка Большие Исады, что порождает явление «этнических кварталов» с характерной атмосферой культурной изоляции, которая, в свою очередь, создает ситуацию культурной отчужденности от традиций местного населения (как мусульманского, так и христианского). Налицо социокультурные противоречия между местными и пришлыми группами населения в регионе, навязывание мигрантами «своей» бытовой культуры, отсутствие уважительного отношения к нормам, принятым в местном сообществе, плохое знание языка межнационального общения, закрытость и клановость мигрантских общин. С увеличением числа мигрантов во многом также связан рост криминогенной обстановки (этнической преступности) в регионе. Агрессивное поведение мигрантов (особенно, северокавказс-кой молодежи) ведет к росту националистических настроений, ксенофобии в местном сообществе.

Северокавказские мигранты-мусульмане-шафииты образовали в Астраханской области религиозные общины-«джамааты», которые формально входят в состав Астраханского регионального управления мусульман (АРДУМ), но фактически пользуются определенной самостоятельностью. Центром кавказских мигрантов-мусульман в Астрахани является мечеть № 3, или т.н. Кавказская мечеть, расположенная на рынке Большие Исады (ул. Красная Набережная, 112. Исторически, это татарская мечеть № 13, или Красная мечеть, построенная на средства татарского купца Шакира Казакова в начале XX в. (Воронов, Прокопенко, 2010). В 1935 г., по решению Астраханского городского совета, мечеть была закрыта (Государственный архив Астраханской области: 307-308), а здание вскоре было передано Дому санитарного просвещения. В 1990 г. здание мечети было возвращено мусульманам (ГААО, 19-32). С 1993 г.

